| | | |
|---|---|---|
| **Udhiyə** | | Qurbanlıq heyvan |
| **Tədhiyə** | | Qurbanı kəsmə əməliyyatı |
| **’İdul-Ədha** | | Qurban bayramı |

**Tədhiyə** müəkkəd sünnətdir, vacib deyildir. Lakin imkan olduğu halda, yəni qurban kəsməyə qadir olduğu halda bunu etməmək məkruhdur.

**Tədhiyə** ibadəti ilə hür olan hər bir müsəlman – istər kişi, istərsə də qadın – müxatabdır. Ölünün adından **udhiyə** kəsmək dirinin adından kəsməkdən daha əfzəldir, çünki ölünün savaba ehtiyacı daha çoxdur.

**Udhiyə** olaraq kəsiləcək heyvan yalnız dəvə, mal-qara və davar (qoyun və ya keçi) cinsindən ola bilər. Bununla bağlı bəzi suallar vardır:

- ✓ **Əgər bütöv bir heyvan kəsiləcəksə bu üçündən ən əfzəli hansıdır?** Məzhəbin rəyinə əsasən ən əfzəl dəvədir, daha sonra inək, daha sonra isə qoyun və sonra keçidir. Altı aylıq qoyun bir illik keçidən daha əfzəldir.
- ✓ **Erkək yoxsa dişi heyvan kəsmək əfzəldir?** Əfzəliyyət baxımından erkək ilə dişi arasında fərq yoxdur, eyni bərabərdədir. Əfzəliyyət cinsdə və heyvanın köklüyündə və dəyərindədir.
- ✓ **Kəsiləcək heyvanın hansı rəngdə olmasında fərq varmı?** Bəli, rənglər arasında fərq vardır. Ən əfzəli tamamilə ağ olandır, daha sonra çoxu ağ olan heyvandır. Bundan sonra sarı rəngdə olandır, fəzilət baxımından ən aşağıda isə qara olandır.
- ✓ **Erkək heyvanda axtalanmış olanın əfzəlliyi varmı?** Bəli, axtalanmış erkək heyvanın qurban kəsilməsi daha əfzəldir, çünki əti daha gözəldir.
- ✓ **Kəsiləcək heyvanın ən az neçə yaşı olmalıdır?** Dəvə ən azından beş illik olmalıdır, inək iki illik, keçi bir illik və qoyun isə altı aylıq ola bilər.
- ✓ **Kəsiləcək heyvan yalnız bir nəfərin adından kəsilə bilər, yoxsa bütün ailənin adından bir heyvan kəsmək icazəlidir?** Cavab budur ki, bütün ailənin adından bir heyvan kəsmək olar.
- ✓ **Bir neçə nəfər birləşib bir heyvanı qurban olaraq kəsə bilərmi?** Dəvə və inəyə gəldikdə birdən çox adam heyvanın

qiymətini aralarında bölərək bir dəvə və ya inək alıb kəsə bilərlər. Bu zaman şəriklərin sayı ən çox yeddi nəfər ola bilər. Bu o deməkdir ki, səkkiz nəfər və daha çox adam bir qurbana şərik ola bilməz, lakin yeddi nəfər şərik ola bilər. Bu dediyimiz yalnız dəvə və inəyə aiddir. Lakin qoyun və keçidə şəriklik icazəli deyildir, yalnız bir nəfər bütöv olaraq bir qoyunu və ya keçini qurban kəsə bilər.

Bu sonuncu sual ilə bağlı əlavə suallara da cavab lazımdır:

- ✓ **Bir bütöv qoyun və ya keçi kəsmək daha əfzəldir yoxsa bir dəvəyə və ya inəyə şərik olmaq?** Əgər dəvə və inəyi bütöv olaraq qurban kəsmirsə, onun sadəcə bir hissəsinə şərik durursa bu zaman bütöv bir qoyunu kəsmək daha əfzəldir.
- ✓ **Artıq kəsilmiş bir dəvənin və ya inəyin yeddidə bir hissəsini almaq kifayət edirmi?** Xeyr, kifayət etmir, çünki o dəvə və ya inək ətinə görə kəsilmişdir, Allaha qurban olaraq kəsilməmişdir.
- ✓ **Qurban kəsmək niyyəti olmayan, sırf ətə görə şərik olmaq istəyənlər ilə birlikdə şərik olmaq olarmı?** Olar, icazəlidir. Əgər yeddi nəfərdən ikisi, üçü və ya daha çoxu yalnız ət almaq niyyəti ilə şərik olursa, sən isə qurban niyyəti ilə şərik olursansa o zaman birlikdə o heyvanı alıb kəsə bilərsiz. Lakin heyvan kəsildikdə qurban olaraq kəsilməlidir.
- ✓ **Şəriklərin qeyri-müsəlman olması icazəlidirmi?** İcazəlidir, bu halda da heyvan kəsilərkən qurban niyyəti ilə kəsilməlidir.
- ✓ **Heyvan (dəvə və ya inək) kəsildikdən sonra şərik olanların sayının yeddi yox, səkkiz olduğu üzə çıxarsa nə edilməlidir?** Bu halda əlavə olaraq bir qoyun da kəsilməlidir ki, səkkizinci kəsin yerini ödəmiş olsun. Əgər doqquz nəfər olduqları üzə çıxarsa iki qoyun kəsilməlidir, bu şəkildə arta bilər.

Kəsilən heyvanların qiymətlərinə zərər verəcək, onların dəyərini aşağı salacaq eyiblər olmamalıdır. Fəqihlərimiz bu eyibləri zikr ediblər:

- **arxası və ya qulağı və ya buynuzunun yarısından çoxu qopmuş heyvan**
- **buynuzunun qabığı sınmış heyvan**
- **qabaq dişləri dibindən çıxmış heyvan**
- **cavan olan, lakin əmcəyi qurumuş, süd verməyən heyvan**
- **sağlam olan heyvan ilə eyni sürətdə yürüməyi bacarmayan heyvan**
- **bir gözü çıxmış heyvan**
- **hər iki gözü də kor olan heyvan**
- **yaradılış baxımdan zəif və arıq olan heyvan**
- **xəstəliyi aşkar və şiddətli olan heyvan**
- **zəkəri və yumurtalıqları kəsilmiş axta heyvan**

Bu eyibləri daşıyan heyvan qurban kimi keçərli deyildir. Lakin bəzi eyiblər vardır ki, onları daşıyan heyvan qurban kimi keçərlidir. Bura bir gözü kor olmuş, lakin yerindən çıxmamış heyvanları, xəstəlikləri aşkar olmayan, şiddətli olmayan heyvanları, qulağının və ya buynuzunun və ya arxasının yarısı və ya yarısından az bir hissəsi qopmuş, kəsilmiş heyvanları göstərmək olar. Buynuzun və ya qulağın yarısı və ya daha az bir hissəsi kəsilmiş, cırılmış, əzilmiş heyvanları qurban olaraq kəsmək keçərli olsa da məkruhdur.

Heyvan əgər yaradılışdan buynuzu yoxdursa və ya yaradılışdan quyruğu yoxdursa, yaxud da quyruğu kəsilibsə və ya yaradılışdan qulağı kiçik olarsa olarsa qurban olaraq keçərlidir və məkruh deyildir. Həmçinin gəbə olan heyvanı da kəsmək keçərlidir. Yuxarıda qeyd edildiyi kimi zəkəri və yumurtalıqları kəsilmiş heyvan keçərli deyildir, lakin yalnız yumurtalıqları kəsilmiş və ya yalnız zəkəri kəsilmiş heyvan olarsa keçərlidir.

**Qeyd**: Əgər heyvanı kəsmə prosesində heyvan zərər görərsə, misal üçün xəta nəticəsində bıçaq gözünü çıxararsa bu, heyvanı keçərsiz etməz, yəni həmin heyvanı qurban üçün kəsmək olar.

| | |
|---|---|
| عَضْبَاء | **Qulağın, buynuzun yarısı yox olan heyvan** |
| عَصْمَاء | **buynuzunun qabığı sınmış heyvan** |
| عَوْرَاء | **bir gözü çıxmış heyvan** |
| عَرْجَاء | **sürətlə hərəkət edə bilməyən heyvan** |
| عَمْيَاء | **iki gözü də kor olan heyvan** |
| عَجْفَاء | **zəif və arıq olan heyvan** |
| هَتْمَاء | **qabaq dişləri kökündən çıxmış heyvan** |
| جَدْبَاء | **südü qurumuş heyvan** |
| صَمْعَاء | **qulaqları yaradılışdan kiçik olan heyvan** |
| جَمَّاء | **yaradılışdan buynuzu olmayan heyvan** |
| بَتْرَاء | **quyruğu olmayan heyvan** |

## HEYVANIN KƏSİLMƏSİ

Dəvəni nəhr etmək, mal-qara və davarı isə zəbh etmək sünnətdir, əksi də icazəlidir. Nəhr etmək heyvanı sol əli bağlı şəkildə ayaq üstə saxlamaq və boyunun sinəyə birləşdiyi nahiyədə bir yerə süngü kimi iti bir alət ilə batırmaqdır. İnəkləri, qoyunları və keçiləri isə sol böyrü üstə uzadaraq qibləyə tərəf tutaraq kəsmək sünnətdir.

Heyvanı kəsmək üçün əli tərpətdikdə, hərəkət etdirdikdə "bismilləh" demək vacibdir və "Allahu Əkbər" demək isə müstəhəbdir. Əgər "bismilləh" deməyi unudarsa vaciblik boynundan düşər, yəni qurban keçərlidir, əlavə bir şey etməsi lazım deyildir. İbn Ömərin mərfu hədisinə əsasən peyğəmbər – salləllahu aleyhi va səlləm – bayram günü iki qoç keçdi; onları qibləyə tərəf uzatdıqda dedi:

"**Vaccəhtu vachi lilləzi fətaras-səməvati val-arda hənifən va mə ənə minəl-muşrikin; innə saləti va nusuki va məhyəyə va məməti lilləhi rabbil-aləmin, lə şərikə ləhu, va bizəlikə umirtu va ənə minəl-muslimin. Bismilləh vallahu əkbər. Allahummə həzə minkə va ləkə.**"

Ona görə də bu sözləri tam şəkildə demək müstəhəbdir. Həmçinin dilərsə "Allahım bunu fulankəsdən qəbul et!" deyərək özünün və başqalarının adlarını çəkə bilər.

Əgər iki heyvan kəsəcəksə, onlardan biri vacib, digəri isə nafilədirsə o zaman birinci vacib olanı kəsməlidir.

Kəsənin müsəlman olması sünnətdir, həmçinin qurbanın sahibinin qurbanı özünün kəsməsi də müstəhəbdir. Lakin özü kəsməzsə onu bir başqa müsəlmana vəkalət olaraq tapşıra bilər, lakin bu zaman onun kəsmə vaxtı orada iştirak etməsi də daha əfzəldir. Kitab əhlinə də vəkalət olaraq tapşırarsa keçərlidir, lakin məkruhdur. Vəkalətdə vəkilin niyyəti etibara alınmır, önəmli olan, yəni etibara alınan, vəkalət vəkilə verildiyi zaman vəkaləti verən qurban sahibinin niyyətidir.

## HEYVAN KƏSMƏYİN VAXTI

Qurbanı kəsmək vaxtı yaşadığı yerdə qılınan ilk bayram namazından sonra başlayır. Əgər şəhərdə bir neçə yerdə bayram namazı qılınarsa onlardan ən tez qılınan bayram namazından sonra qurbanı kəsmək olar. Bununla bağlı bəzi suallara cavab vermək lazımdır:

- ✓ **Bayram namazı qılındıqdan sonra qurbanı kəsmək üçün xütbənin bitməsini gözləmək şərtdirmi?** Cavab budur ki, namaz qılındıqdan sonra xütbə başlamasa belə qurbanı kəsmək olar, xütbəni gözləmək şərt deyildir. Lakin əlbəttə ki, xütbədə oturmaq və axıra qədər dinləmək daha əfzəldir.
- ✓ **Cümə namazının qılınmadığı kəndlərdə və bölgələrdə vaxt nə zamandan başlayır?** Bu kimi yerlərdə bayram namazının vaxtı girdikdən sonra bayram namazını qılmaq üçün lazım olan vaxt keçdikdən sonra qurbanı kəsmək olar.
- ✓ **Bayram namazının qılındığı bir yerdə yaşayan, lakin bayram namazına gəlməyən kəs də vaxt girdikdən sonra namaz miqdarında bir müddət keçərsə qurbanı kəsə bilərmi?** Xeyr, bayram namazı qılınan yerlərdə yalnız bayram namazı həqiqətdə qılınıb bitdikdən sonra qurban heyvanı kəsilə bilər. Əgər kimsə şəhərdə qılınan ilk bayram namazı bitmədən heyvanını kəsərsə o heyvan qurban sayılmaz.
- ✓ **Əgər bayram namazı qılınan yerdə namaz gecikdirilərsə o halda nə zaman kəsmək olar?** Bu halda bayram namazının qılınmasını gözləmək şərtdir, lakin zöhr namazının vaxtı girənə qədər bayram namazı qılınmazsa heyvanını kəsə bilər.

Qurbanı kəsmək vaxtı üç gündür və təşriq günlərindən ikinci günün bitməsi ilə qurban üçün ayrılmış müddət bitir. Başqa sözlə zül-hiccə ayının on ikisi günəşin batması ilə qurbanı kəsmək vaxtı bitir.

Quranı kəsmək üçün ən əfzəl vaxt bayran namazı ilə xütbə bitdikdən və imam öz qurbanını kəsdikdən sonradır. Üç gündən ilk günü qurbanı kəsmək üçün daha əfzəldir, daha sonra ikinci gün və sonra üçüncü gün əfzəldir. Qurbanı gecə vaxtı kəsərsə keçərlidir, lakin məkruhdur.

- ✓ **Bu üç gün bitərsə və qurbanı kəsməyə niyyətli olan kəs qurbanını kəsməzsə nə etməlidir?** Əgər qurban vacib qurbandırsa, misal üçün nəzir qurbanıdırsa o zaman vaxt keçsə də onu kəsməsi vacibdir. Lakin əgər nafilə qurbandırsa o zaman edəcəyi bir şey yoxdur, çünki qurban kəsmək üçün ayrılmış vaxtı əldən vermişdir.
- ✓ **Əgər vaxt keçdikdən sonra qurban niyyəti ilə heyvan kəsərsə qurban olaraq keçərlidirmi?** Xeyr, keçərli deyildir və qurban sayılmır. Sadəcə ətdir və onunla dilədiyi kimi davrana bilər; istəyərsə hamısını özü yeyər, istəyərsə sədəqə verər.
- ✓ **Bir heyvanı alaraq onun qurbanlıq olduğunu demək o qurbanı vacib edirmi?** Bəli, əgər dili ilə heyvanın qurbanlıq olduğunu deyərsə və yaxud da qurbanlıq niyyətinin olduğuna dəlalət edən bir fel edərsə o zaman aldığı heyvanı qurban olaraq kəsmək vacib olur.
- ✓ **Əgər bayramdan öncə aldığı qurban xəstələnərsə və öləcəyi gözlənildiyi üçün vaxtından öncə kəsərsə qurban sayılacaqmı?** Xeyr, bu kəsim qurban sayılmayacaq, əksinə heyvanı alarkən onu qurbanlıq üçün ayırmışdısa vaxtından öncə kəsdiyi üçün onun əvəzinə başqa heyvan kəsməlidir. Lakin əgər bayramdan öncə ölərsə heyvanı qurbanlıq üçün ayırmış olsa belə ona heç bir şey vacib deyildir.
- ✓ **Qurban olaraq təyin edilmiş heyvanın südündən içmək olarmı?** Cavab budur ki, olar. Lakin balası doyunca içdikdən sonra geridə qalan süddən içmək olar, balası içib doymadan öncə onun südündən içmək olmaz.
- ✓ **Qurbanlıq heyvanın yununu kəsmək və ondan istifadə etmək olarmı?** Bunu etmək icazəlidir, diləyərsə öz evində ondan istifadə edər, dilərsə onu sədəqə verə bilər.
- ✓ **Əgər iki nəfərdən hər biri qurbanlıq heyvan alarsa, daha sonra bu iki heyvan səhv düşərsə və hər biri digərinin heyvanını kəsmiş olarsa keçərlidirmi?** Bəli, keçərlidir. Əgər heyvan

kəsildikdən sonra və ət paylanılmadan öncə səhv düşdüyü ortaya çıxarsa o zaman ətlər sahiblərinə qaytarılmalıdır, lakin hər bir halda keçərlidir.

- ✓ **Əgər qurbanlıq olaraq aldığı heyvanı bir başqası sahibinin izni olmadan kəsmə vaxtında kəsərsə qurban olaraq keçərlidirmi?**
  Əgər həmin adam heyvanın başqasının qurbanlığı olduğunu bilmədən onu öz adından qurban olaraq kəsərsə, lakin ətini hələ paylamayıbsa o zaman qurban onun sahibinin adından keçərlidir. Həmçinin əgər heyvanı iznsiz olaraq heyvanın sahibinin adından kəsərsə yenə keçərlidir, çünki dediyimiz kimi etibara alınan heyvanın sahibinin niyyətidir. Lakin əgər heyvanın başqasının qurbanlığı olduğunu bilərəkdən onu öz adından qurban olaraq kəsərsə bu halda heyvan nə kəsənin, nə də heyvanın sahibinin adından qurban olaraq keçərli sayılmır. Bu halda heyvanı iznsiz kəsən əgər ətini paylamayıbsa onu sahibinə qaytarmalı və kəsilmiş heyvan ilə diri heyvan arasındakı qiymət fərqini qarşılamalıdır. Əgər əti artıq paylayıbsa o zaman diri heyvanın pulunu ödəməlidir.

Bura qədər zikr etdiklərimizdən biz qurban kəsiminin şərtlərini çıxara bilərik. Beləliklə də qurban kəsiminin şərtləri dörddür:

1. Heyvanın dəvə, inək və davar cinsindən olması
2. Heyvanın dəyərini düşürəcək qüsurlardan salamat olması
3. Heyvanı kəsmək vaxtının daxil olması
4. Heyvanı kəsənin kəsimə yararlı olması; yəni ya müsəlman, ya da kitab əhli olması

## BƏZİ MƏSƏLƏLƏR

Kəsilən **udhiyə**’ni üç yerə, bir hissəsini yemək üçün, digər hissəsini hədiyyə üçün, üçüncü hissəsini isə sədəqə üçün ayırmaq sünnətdir. Ən yaxşı hissəsini sədəqə verir, orta hissəsini hədiyyə edir və yerdə qalanını isə yeyir. Bu, həm də nəzir ilə vacib olmuş qurbana da aiddir. Bununla bağlı bəzi suallara cavab lazımdır:

- ✓ **Kəsilən udhiyə’dən kafirə hədiyyə vermək və ya sədəqə etmək icazəlidirmi?** Bəli, kafirə kəsilən heyvandan hədiyyə etmək və ya sədəqə vermək icazəlidir. Lakin udhiyə, yəni qurban nəzir qurbanıdırsa bu halda ondan kafirə hədiyyə etmək olmaz, çünki vacib olan qurbandan kafirə vermək icazəli deyildir, necə ki, zəkatdan və kəffarədən kafirə vermək olmaz.
- ✓ **Kəsilən qurbanın hamısını sədəqə verə bilərmi?** Bəli, əgər istəyərsə kəsdiyinin hamısını sədəqə verə bilər. Bəzi alimlər deyiblər ki, hamısını sədəqə verməsi icazəli deyildir, bir hissəsini özü yeməlidir, çünki Allah – cəllə cələluhu – buyurur: “**... o zaman onlardan özünüz də yeyin, aza qane olan kasıba və dilənçiyə də yedirin!**” (Həcc surəsi, 36) Lakin məzhəbin mötəməd rəyinə əsasən hamısını sədəqə vermək icazəlidir, buradakı “yemək” əmri isə müstəhəblik ifadə edir.
- ✓ **Kəsilən qurbanın hamısını özü və ailəsi yeyə bilərmi?** Xeyr, onun hamısını yemək olmaz, onun bir hissəsini sədəqə olaraq miskinlərə verməsi vacibdir.

Bu sonuncu sual ilə bağlı bəzi əlavə suallara cavab lazımdır:

- ✓ **Əgər qurban ətindən iki yüz qramını ayırıb, ondan yemək bişirərsə və miskinlərə o yeməkdən ziyafət verərsə kifayət edirmi?** Xeyr, kifayət etmir. Əti çiy olaraq kasıba və ya kasıblara təslim etməsi şərtdir.

- ✓ **"Bir hissə" deyildikdə nə qədər miqdar qəsd olunur?** "əl-Mubdi" kitabında bu bir hissəni bir uqiyə olaraq müəyyən etmişdir. Bir uqiyə isə müasir çəki ilə 200 qram edir.
- ✓ **Əgər ətin hamısını yeyərsə, sədəqə verməyə bir şey qalmazsa nə etməlidir?** Bu zaman ən minimum miqdarı çiy ət olaraq sədəqə verməlidir, çünki miskinlərə verilməsi vacib olan bir şey tələf olduqda onun təzminatı ödənilməlidir. Sadəcə iki yüz qramlıq ətin pulunu verməsi kifayət etmir.
- ✓ **Əgər kəsilən heyvan yetimin malındandırsa vəlisinə onun bir hissəsini sədəqə vermək vacibdirmi?** Xeyr, vacib deyildir, əksinə haramdır. O ətdən heç bir şeyi sədəqə verə bilməz, lakin hamısını yetim üçün saxlamalıdır, çünki yetimin malından başqalarına sədəqə vermək olmaz.
- ✓ **Kəsilmiş qurban ətini üç gün və daha çox müddətə saxlamaq olarmı?** Olar, çünki qurban ətini üç gündən artıq saxlamağı qadağan edən hədis xüsusi bir hal ilə bağlı istisna idi, bütün ümmət üzərində keçərli olan bir hökm deyildi.
- ✓ **Qəssabın haqqını/ücrətini kəsdiyi qurbanın ətindən vermək olarmı?** Xeyr, bunu etmək haramdır. Lakin diləyərsə qəssabın ücrətini başqa bir şey ilə qarşıladıqdan sonra qurbanın ətindən ona hədiyyə olaraq və ya sədəqə olaraq verə bilər.
- ✓ **Qurban ətindən bir şeyi satmaq olarmı?** Xeyr, qurban ətindən bir şey satmaq haramdır.

Əgər ailədə kişinin kəsmək imkanı varsa, lakin kəsmirsə, zövcəsi ərinin izni olmadan qurban kəsə bilər. Eləcə də borclu olan kəs borcu ödəmə vaxtı gəlmədiyi və borc sahibinə zərəri olmadığı təqdirdə qurban kəsə bilər. İmkanı olmayan kəslər də qurban kəsmək üçün borc pul ala bilərlər, lakin bu zaman həmin borcu qaytara biləcəklərini güclü bir şəkildə güman etmələri şərtdir, əgər o borcu qaytara bilməyəcəklərini güman edərlərsə buna görə borc almamalıdırlar.

**Udhiyə** kəsməyə niyyəti olan kəsin və adından **udhiyə** kəsiləcək şəxsin zul-hiccə ayının ilk on günü daxil olduqda dırnağından və tükündən bir şey götürməsi haramdır. Bu, heyvanı kəsənə qədər belə davam etməlidir. Əgər bilərək və ya unudaraq və ya hökmünü bilmədən saçdan, dırnaqdan

və ya dəridən bir şey alarsa o zaman sadəcə tövbə etməli, Allahdan bağışlanma diləməlidir. Heyvanı kəsdikdən sonra isə öz tüklərindən götürməsi sünnətdir.

- ✓ **Başqası üçün qurban kəsmək tapşırığını öz üzərinə götürmüş kəsə də dırnağından, saçından götürmək haramdırmı?** Xeyr, yalnız öz adından qurban kəsən və adından qurban kəsilən kəsə bunu etmək haramdır.
- ✓ **Kiçik uşağın adından qurban kəsmək olarmı?** Bəli, kiçik uşaqların adına qurban kəsmək keçərlidir.
- ✓ **Ana bətnində olan uşağın adından qurban kəsmək keçərlidirmi?** Xeyr, ana bətnində olan uşaqların adından qurban kəsmək keçərli deyildir, heç bir məzhəb buna izn vermir.